## RƏHMLİ, MƏRHƏMƏTLİ ALLAHIN ADI İLƏ!

Şükür etdiyimiz, kömək və bağışlanma dilədiyimiz Allaha həmd olsun! Nəfsimizin, qəlbimizin şərindən və əməllərimizin pisliklərindən Ona sığınır, Ondan yardım diləyirik! Həqiqətən, Allahın doğru yola yönəltidiyi kəsi heç kim azdıra bilməz və Allahın azdırdığı kəsi heç kim doğru yola yönəldə bilməz. Şəhadət verirəm ki, O təkdir, şəriki yoxdur, ibadətə layiq yeganə haqq məbuddur və Məhhəmməd (s) Onun qulu, elçisi və peyğəmbərlərin sonuncusudur.

### 1

Hind Küveytdə dünyaya göz açan bir ərəb qızıdır. Bu körpə qızcığazın baldırlarının birində xərçənk xəstəliyinin ən ağır forması aşkar olunmuş, üzərində Hüseyn Məkki Cüma adına Küveyt Xərçənk Cərrahiyyə Mərkəzində sıx-sıx müayinələr aparılmış və bu diaqnozla da Amerika Birləşmiş Ştatlarının Corciya ştatının Atlanta şəhərində Xərçənk Xəstəliklərinin Müalicəsi üzrə Xüsusi Mərkəzdə ciddi müalicə almışdır. Bu müalicələrə təxminən yarım milyon dollara qədər pul sərf olunmuş, analiz və diaqnoz üçün praktik sorğuların nəticələrindən böyük bir qovluq yaranmış və baldırda adı çəkilən xəstəliyin mövcud olmasını təsdiq edən rentgen plyonkalarının sayı iki yüz əllini keçmişdir.

Dəqiq diaqnostik müayinədən sonra müalicənin bir mərhələsi kimyaterapiya (kimyəvi üsulla müalicə) ilə həyata keçirildi. Lakin bu heç bir müsbət nəticə vermədi. Halbuki, hər iki mərkəzdəki yüksək ixtisaslı həkimlər kimyəvi üsulla müalicə metodunun maksimum üç həftə ərzində effektiv nəticəyə gətirib çıxaracağını təkidlə söyləmişdilər. Müalicənin üçüncü mərhələsində həkimlər Hindin valideynlərinə yaxın gələcəkdə bədənin digər orqanlarında xərçənk hüceyrələrinin peyda olması ehtimalını aradan qaldırmaq üçün onun xəstə ayağının amputasiyasını[1] tövsiyə etmişdilər. Çünki faciə ünsürlərindən biri də Hindin bir çox qohumlarının eyni xəstəliyə düçar olması idi.

Bu kiçik qızcığazın üzündəki hüzn, kədər, ağrı atasının Amerika universitetlərinin birində informatika sahəsində doktorluq dissertasiyasını başa çatdırmaq üçün gündəlik iş planını da pozmuşdu. Tələbə olan anası isə uzun gecələri qorxu və narahatçılıq içində, kiçicik qızının gələcək həyatını düşünərək keçirirdi. Lakin onun Allaha olan inamı Onun qəzavü-qədərinə təslim olmağa vadar edirdi.

Bir gecə yenə ana çarpayısına uzanaraq uzun-uzadı fikrə getdi, xəyallar aləmində uçmağa başladı. Bu an onun gözlərində körpə balasının əsaya dirsəklənərək bir ayaq üstə gəzməsi canlandı. Gözləri dolmuş, göz yaşlarından çarpayı tam olaraq islanmışdı. Ana fikirdən ayrılaraq qovulmuş şeytandan Allaha pənah apardı və Onu bir həyacan və ruh yüksəkliyi ilə durmadan zikr etməyə başladı. Birdən onun yadına nə vaxtsa eşitmiş olduğu bir şey düşdü. Bu istixarə namazı idi. Sıçrayaraq yerindən durdu və onu qılmağa tələsdi.

Səhər açılanda ana bütün müalicə növlərindən, qızına hər gün verdiyi dərmanlardan imtina etdi və onun ayağının amputasiyasına əsla razılıq verməyəcəyini qərara aldı. Çünki artıq Allah-taala ona bütün müalicə üsullarından və hər növ dava-dərmandan fərqli olan başqa bir müalicə metodu göstərmişdi. Bu metod Allahın möminlər üçün şəfa və mərhəmət ocağına çevirdiyi Qurani-Kərim idi.

Nəticə bir nəfərdən başqa hər kəs üçün – yenidən həyata qayıdan, öz uşaqlıq təravətini hiss etməyə başlayan körpə qızcığaz üçün, həkimlərin amputasiyadan başqa bütün üsulların tükəndiyi qərarına gəlmələrindən sonra az qala sağalmağa olan bütün ümidlərini itirən qohumlar üçün son dərəcə gözlənilməz olmuşdu. Lakin şeyx gülümsəyərək nəticənin heç də ondan ötrü gözlənilməz olmadığını və Allahın Öz ayələrini hər bir dərdə şəfa göndərdiyini söyləyərək aşağıdakı ayəni oxumuşdu:

---

[1] Bədənin xəstə üzvünün kəsilməsi.

**«Biz Qur'andan mö'minlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O, zalımların (kafirlərin) ancaq ziyanını artırır».**[2]

Amerikada adı çəkilən mərkəzdəki təcrübəli bir həkim Hindin səhhətindəki müsbətə doğru qeyri-adi inkişafı – onun təbii halını öz gözü ilə görməyənədək təsdiqləyə bilmədiyini bəyan etmiş və eşidəndə ki, Hind hətta artıq ayaqları üstündə tam sərbəst qaça bilir və onun başında və bədəninin tükü tökülmüş başqa yerlərində yenidən tük çıxır, son dərəcə təəccüblənərək çaş-baş qalmış və balaca Hindi hansı yolla olur olsun, görməyi tələb etmişdir.[3]

## 2

Gənc bir oğlan öz həmyaşıdı bir qızla evlənmək istəyir. İstixarə namazı qılaraq bu işdə Allahdan xeyirli olan nədirsə, onu istəyir. Qızın "Hə"sini almaq üçün ona elçi göndərmək istədikdə böyük qardaşı onun bu qızla evlənməsinə qarşı çıxır və ona başqa bir ailədən qız tapmağı məsləhət görür. Oğlan hey çalışır ki, qardaşını yola gətirsin, onu razı salsın, lakin onun bu cəhdləri tam uğursuzluqla nəticələnir. Düşdüyü çıxılmaz vəziyyətlə barışaraq təslim olmağa məcbur olur və başqa bir ailədən gənc bir qızla ailə həyatı qurur. Toyundan bir neçə gün sonra isə sevib evlənə bilmədiyi qız vəfat edir. Beləliklə, məlum olur ki, qardaşının həmin qızı almasına etiraz etməsi bir növ onun daha xeyirli olanı seçməsinə səbəb olmuşdur.

## 3

Haqq yolundan uzaq düşmüş gənc bir oğlan şirkətlərin birində səhər-axşam növbəsində yaşayışın bir çox tələbatlarını ödəmək iqtidarında olmayan cüzi bir maaş qarşılığında işləyirmiş. O vaxtının əksəriyyətini iş yerində keçirirmiş.

Nəhayət bir gün Allah-taala onu hidayət yoluna yönəldir, gənc Tanrısı, yaradıcısı olan Allah qarşısında ən böyük təqsirini hiss etməyə başlayır. Ürəyindən Quran əzbərləmə dərnəklərinə qoşulmaq, saf və şirin səlsəbil[4] bulaqlarından susuzluğu yatırtmaq üçün məscidlərdəki dərslərdə və mühazirələrdə iştirak etmək keçir. Lakin onun iş recimi, nəinki bu arzularını həyata keçirməyə, hətta öz arvadı və uşaqlarına də kifayət qədər vaxt ayırmasına, ailənin zəruri ehtiaclarını ödəməsinə imkan vermir.

Bir gün onunla qarşılaşdım. Halından şikayətlənərək məndən məsləhət istədi və Allah-taala onu haqq yoluna yönəltdikdən bəri həmin şirkətdəki işinə nifrət etdiyini, Quran öyrənməsinə, elmi məclislərdə iştirak etməsinə imkan verəcək yeni iş yeri axtardığını bildirdi. Ondan: "Sən istixarə namazının nə olduğunu bilirsənmi?" – deyə soruşduqda cavabı mənfi oldu. Ona istixarə namazını öyrətdim və dərhal gedib onu qılmasını, bu işini buraxıb başqa iş axtarmasında Allahdan xeyirli olan nədirsə, onu istəməsini söylədim. Bir neçə gündən sonra o sevincək bir halda yanıma gəlib dedi: "Allah Öz qapılarını mənim üzümə açdı, işimi asanlaşdırdı. Mənə daha yüngül recimli və daha çox maaşı olan bir iş nəsib elədi. İndi bu işim mənə dünya işləri ilə yanaşı elm öyrənməyimə də imkan verir". Mən ondan bütün bunların belə tez bir müddətdə necə baş verməsini soruşduqda əhvalatı belə nağıl etdi: "Bir məclisdə əyləşmişdim. Məclisə gələnlər arasında bir nəfər iş adamı da var idi. Söhbət əsnasında o şirkətdə onunla birgə işləmək üçün etibarlı, dürüst bir işçiyə ehtiyacı olduğunu söylədi. Mən də onun bu təklifini qəbul etdim. Hər şey bu qədər asan oldu".

## 4

Bir yoldaş söyləyir:

---

[2] əl-İsra, 82.
[3] Balaca Hindin bu hekayəsi Küveyt mətbuatında, qəzetlərində dəfələrlə geniş şəkildə işıqlandırılmışdır.
[4] Səlsəbil – Cənnət bulağı.

“Universitetdə təhsilimi başa vurduqdan sonra təyinatımı bir müəllim kimi uzaq və əhalinin sıx olduğu bir rayonda orta məktəblərin birinə aldım. Yeni tədris ilinin başlamasından təxminən üç həftə keçmişdi ki, mən müəyyən səbəblərə görə bu məktəbdə müəllim işləmək istəmədim. Üçüncü həftənin sonu yaxınlaşdıqda vəziyyət daha da mürəkkəbləşdi, mənim səbir kasam doldu və daha bu məktəbdə qalıb işləməyə dözə bilmədim. Qarşımda iki yolum var idi. Ya işdən çıxmaq barədə ərizə yazmalı, ya da təyinatımı başqa bir məktəbə dəyişməli idim. Birinci yolu seçmək mənim üçün çətin bir qərar idi. İkincisinə gəlincə, bu da demək olar ki, qeyri-mümkün idi. Çünki təyinatı dəyişdirmək adətən ancaq yeni dərs ilinin başlanğıcında mümkün ola bilərdi. İndi isə gec idi. Çıxılmaz vəziyyətə düşmüşdüm. İstixarə namazı qıldım, səmimi qəlbdən Allaha dua edərək mənə ən xeyirli olanı nəsib etməsini istədim. Çünki Onun hər şeyə qadir olduğuna bütün varlığımla inanırdım. Hər şey mənim üçün surpriz oldu. Növbəti gün sinif otağının qapısının ağzında yeni bir müəllim dayanaraq mənim filankəs olduğumu soruşdu. Mən də ona özümü təqdim etdi. O mənə təyinatımın başqa məktəbə dəyişdirilməsi barədə yeni qərar çıxdığını söylədi və mənim sabahdan həmin məktəbdə işə başlamalı olduğumu söylədi. Səhərisi gün mən Allahın istəyi ilə yeni məktəbdə işə başladım və orada həqiqi bir rahatlıq və arxayınçılıq tapdım. Şübhəsiz ki, bu işdə güc və qüdrət sahibi olan Allahın məni tək və köməksiz buraxmadığı üçün Ona bol-bol həmd-sənalar oxumağı da unutmadım”.

*** * ***

Beləliklə, hörmətli oxucular! Əziz müsəlman qardaş və bacılar! Siz bu hekayələri oxuduqdan sonra uğurun, müvəffəqiyyətin sirrinin, habelə xeyir-bərəkət açarının nə olduğunu yəqinki biləcəksiniz. Elə isə bir daha yadınıza salırıq: bu **istixarə namazıdır!**

# İSTİXARƏ NAMAZI NƏDİR?

***1. Tərifi.***

İstixarə استخارة – sözü lüğətdə seçmək; daha üstün tutmaq mənalarında olan خار (i) – felinin onuncu bab məsdər forması olub Allahdan ən xeyirli olanı istəmək, kömək diləmək mənalarını ifadə edir.[5]

***2. Fəziləti və əhəmiyyəti.***

Nə qədər ağıllı, elmli və müdrik olur olsun, hər bir insan öz Rəbbinə, onu yaradana istənilən an möhtacdır və əbədi olan bu yeganə varlıq hər bir göz qırpımında belə mütləq ona lazımdır.

Çox vaxt insanlar mühüm olan hər hansı biri işi həyata keçirtmək istədikdə, öncədən bunun üçün böyük bir plan cızır, müvəffəqiyyət əldə etmək üçün hər bir lazımi tədbiri görür və bu iş üçün ehtimal olunan fövqəladə şəraitdə belə atılacaq addımları təxmin edirlər, necə deyərlər, yüz ölçüb bir biçirlər. Sonradan isə onların bu işdə böyük səhvə yol verməleri, nəzərdə tutduqları ehtimalların və təxmin etdikləri ölçülərin onları aldatması aşkara çıxır və nəticə etibarı ilə bütün səylər uğursuzluqla nəticələnir. Yaxud da bəzən insan elə situasiyalara düşür ki, bir-birindən fərqli iki və ya daha çox seçim qarşısında tərəddüd edir, hansının onu məqsədinə çatdıracağını müəyyənləşdirə bilmir. Atacağı hər hansı bir yanlış addımın isə bəlkə də onun məhvi və həlakı ilə nəticələnəcəyini dərk edərək tərəddüd, həyəcan və çaşqınlıq içində qalaraq boğulur.

Ərəblər Cahiliyyət dövrü adlanan İslamdan əvvəlki dönəmdə bu tərəddüdü və çaşqınlığı aradan qaldırmaq üçün çox sadəlövh bir üsula qaçırdılar. Bu, fal üçün nəzərdə tutulmuş lələksiz oxlarla qisməti təyin etmə və ya seçimin müəyyənləşdirilməsi (استقسام بالأزلام) üsulu idi. Oyunun qaydası belə idi: oyunda üç ox olardı. Onlardan birinə "Et!", digərinə "Etmə!" yazılar, üçüncüsü isə boş saxlanılardı. Oxlar fırladılar, əmr oxu çıxsaydı, iş icra olunar, qadağa oxu çıxsaydı, icra olunmazdı. Yazı olmayan ox çıxsaydı oxlar bir daha fırladılardı. Lakin İslam gəldikdən sonra Allah-taala möminlərə bu fal oyununu haram edərək onu Allahın təkliyini, Onun kamilliyini, rübubiyyətini vəsf edən sifətləri özündə cəmləşdirən, hər şeyi onun ixtiyarına buraxan, ancaq Ondan kömək istəməyin, Ona təvəkkül etməyin vacibliyini və güc-qüvvət sahibinin təkcə Allah olduğunu təsdiqləyən, bəndənin Allah qarşısında öz acizliyinin və qüsurlarının etirafı olan istixarə namazı və duası ilə əvəz etmiş və buyurmuşdur: **«Ölü heyvan, qan, donuz əti, Allahdan başqasının adı ilə kəsilmiş, boğulmuş, (ağac, daş və s. ilə) vurulub öldürülmüş, (hündür bir yerdən) yıxılıb gəbərmiş, buynuzlanıb öldürülmüş, yırtıcı heyvan tərəfindən parçalanıb yeyilmiş, – (ölməmiş çatıb) kəsdikləriniz istisnadır, – dikili daşlar (bütlər və s.) üzərində kəsilmiş heyvanlar və fal oxları ilə qismət axtarmanız sizə haram edildi. Bunlar günahdır. Bu gün kafirlər dininizdən (İslamı məhv etməkdən) əllərini üzdülər. Onlardan qorxmayın, Məndən qorxun. Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və din olaraq sizin üçün İslamı bəyənib seçdim. Hər kəs günaha meyl etməyərək aclıq üzündən (haram olanlardan istifadə etməyə) məcbur olarsa, şübhəsiz ki, Allah bağişlayandir, rəhmlidir».**[6]

Allah-taalanın bəndələrinə olan mərhəməti, mükəmməl fəziləti və şəfqətindəndir ki, onlara Rəbbi qarşısında yalnız bir neçə dəqiqələrini sərf etmələrinə başa gələn, mühüm və ya adi, böyük və ya kiçik olan bütün işlərində Ondan ən xeyirli olan nədirsə, onu istəmələri üçün belə bir namaz təyin etmişdir. Bu namaz asan tərkibə malik bir namazdır. Ömür davam etdikcə ən xeyirli olanı gətirər, onu qılanın üzünə bütün bədbinlik qapılarını bağlamış olar. Çünki düzgünlüyə ancaq Allahın istəyi ilə nail olmaq mümkündür. Ona görə də hər kəs bu yolla Allahdan ən xeyirli olanı diləməli, uğura və zəfərə çatmaq üçün bu yoldan azı dişləri ilə bərk-bərk yapışmalıdır.

İstixarə namazının əhəmiyyətini göstərən faktorlardan biri də Peyğəmbərin (s) bu namazı bir quran surəsi kimi səhabələrinə öyrətməsindəki marağı və israrı idi. Cabirdən (Allah ondan

---

[5] Bu barədə bax: "Lisan əl-Arab" izahlı lüğətinə.
[6] əl-Maidə, 3. Bu ayə barəsində İbn Kəsirin təfsirinə müraciət edə bilərsiz.

razı olsun!) bu barədə belə deməsi rəvayət olunur: "Peyğəmbər (s) bütün işlərdə istixarə etməyi bir quran surəsi kimi bizlərə öyrədərdi".

Yuxarıda Cabirdən nəql olunan cümlədə bir məqamı – "...bütün işlərdə..." hissəciyini xüsusi qeyd etmək lazımdır. Çünki bu məqam istixarə namazının son dərəcə əhəmiyyətli və fəzilətli bir ayin olmasını bir daha təsdiq edir.

***3. Forması.***

İstixarə namazı hər bir müsəlman bəndənin istədiyi vaxt qıla biləcəyi iki rükətli qeyri-fərz namazıdır. Namazın birinci və ikinci rükətlərində əl-Fatihə və Qurandan istənilən surənin qiraətindən sonra salamdan qabaq, ya səcdədə, ya da təşəhhüddün ardınca istixarə duası oxunulur. Duanın salamdan sonra da edilməsinə icazə verilmişdir.

***İstixarə hədisi və onun duası:*** Cabir ibn Abdullahdan (Allah ondan razı olsun!) bu barədə belə deməsi rəvayət olunur: «Peyğəmbər (s) bütün işlərdə istixarə etməyi bir quran surəsi kimi bizlərə öyrədərək deyərdi: "Kim bir iş görmək niyyətindədirsə, iki rükət qeyri-fərz namazı qılsın, sonra isə belə desin: "Allahım! Sənin elminlə Səndən ən xeyirli olanı diləyir, Sənin qüdrətinlə Səndən güc-qüvvət istəyirəm. Səndən əzəmətli fəzilətini diləyirəm. Sən qadirsən, mən isə acizəm. Sən bilirsən, mən isə xəbərsizəm. Həqiqətən, qeybləri (görünməyənləri) bilən ancaq Sənsən! Allahım! Bu işimin (görüləcək işin adı çəkilir) mənim dinimdə, məişətimdə və işimin sonunda, gec və ya tez olmasının mənim üçün xeyirli olacağını bilirsənsə, onu mənim qismətimə daxil et, asanlaşdır və bərəkətli et. Yox, əgər bu işimin (görüləcək işin adı çəkilir) mənim dinimdə, məişətimdə və işimin sonunda, gec və ya tez olmasının mənim üçün xeyirli olmayacağını bilirsənsə, onu məndən, məni də ondan uzaqlaşdır. Mənə harada olur olsun, xeyirli olanı nəsib elə və sonra da məni ondan razı sal"».[7] Hər bir müsəlman bu duanı əzbərləməli və bununla istixarə namazında dua etməlidir.

***4. İstixarə namazını məscidə salam və konkret sünnət namazları ilə birləşdirmək olarmı?***

İstixarə namazının məscidə salam namazına birləşdirilməsinə (burada söhbət iki niyyətin bir namazda cəmləşdirilməsindən gedir) alimlər yekdilliklə müsbət cavab vermişlər. Sual oluna bilər ki, bu necə olur? Cavab: insan məscidə daxil olur, istixarə niyyətilə iki rükət namaz qılır. Çünki salam namazının mahiyyəti məscidə daxil olarkən iki rükət namaz qılmamış oturmamaqdır. Bu ayini istixarə namazını qılmaqla da icra etmək mümkündür.

Konkret sünnət namazlarına gəlincə, onların istixarə niyyəti ilə bir namazda cəmləşdirilməsi caiz deyildir. Ancaq buna o halda icazə verilir ki, məhz sünnət niyyətilə qılınan iki rükətli namaza istixarə niyyəti də daxil edilsin. Çünki sünnət namazı daha əsasdır və onun istixarə namazının iki rükətindən fərqli olaraq ayrıca məqsədi vardır. Lakin ən mükəmməli odur ki, istixarə namazı heç bir namaza birləşdirilmədən, müstəqil olaraq qılınsın.[8]

---

[7] Hədisi Buxari rəvayət etmişdir.

[8] Şeyx Məhəmməd ibn Useymin bu barədə ona verilən sualı belə cavablandırmışdır:
"İbadətlərin, dini ayinlərin biri-birinə qarışıdırılıb-qarışdırılmaması, yəni bir niyyətdə cəmləşdirilməsi mühüm bir məsələdir. Burada məsələyə bir neçə aspektdən yanaşmaq lazım gələcək:
Birinci: əgər bir ayin başqa bir ayinlə əlaqədardırsa, onları biri-birinin tərkibinə daxil etmək, yəni iki niyyəti birində cəmləşdirmək olmaz. Məsələn, sübh namazının sünnətini onun fərzinə qatmaq olmaz və eyni zamanda da fərz sünnətlə birləşdirilə bilməz. Çünki sünnət birbaşa fərzlə əlaqədardır.
İkinci: əgər iki ayin müstəqildirsə və onların hər birinin ayrı-ayrılıqda özünəməxsus məqsəd və mahiyyətləri varsa, onları bir-birinə qatmaq, iki niyyəti birində cəmləşdirmək olmaz. Məsələn, həm işa namazının sünnəti həm də vitr namazının iki rükəti niyyətlərini bir ikirükətli namazda cəmləşdirmək məqbul deyildir. Çünki bu namazların hər birinin ayrı-ayrılıqda özünəməxsus məqsəd və mahiyyətləri vardır.
Üçüncü: iki namazdan birinin özünəməxsus ayrıca məqsəd və mahiyyəti olmadıqda onları bir namazda cəmləşdirməyə icazə verilir. Lakin burada da birləşdirilən əsas, birləşən isə ikinci dərəcəli olmalıdır. Məsələn, sübh namazının azanından sonra məscidə daxil olub sübhün sünnəti niyyəti ilə iki rükət namaz qılınırsa, bura salam namazının niyyətini də qatmaq olar. Çünki salam namazında nəzərdə tutulmuş ayrıca bir məqsəd yoxdur. Onun mahiyyəti sadəcə məscidə daxil olarkən iki rükət namaz qılmamış əyləşməməkdir, bunu sübhün sünnətini qılmaqla da icra etmək mümkündür. Lakin bunun əksinə, yəni salam niyyətilə namaza durub sübhün sünnətini bura qatmağa icazə verilmir. Çünki sübhün sünnət namazı əsas, salam namazı isə ikinci dərəcəlidir".

***5. İstixarə namazının vaxtı.***

Dində istixarə namazı üçün konkret bir vaxt müəyyənləşdirilməmişdir. Şəriətə görə istixarə namazı namaz üçün qadağan olunmuş vaxtlar[9] istisna olmaqla istənilən vaxt, xüsusilə də gecənin son üçdəbiri, azanla iqamə arası kimi duanın tez qəbul olunduğu vaxtlarda qılına bilər. Əgər istixarə obyekti olan işin qadağan olunmuş vaxtlardan dolayı ötürülmə ehtimalı varsa, bu vaxtlarda da namaz qılmağa icazə verilir.

***6. Yalnış etiqad.***

Bəziləri elə hesab edirlər ki, istixarə namazı gecə yatmaqdan qabaq qılınmalıdır. Bunu da onunla əlaqələndirirlər ki, Allah həmin adama yuxusunda istixarənin cavabının mənfi və ya müsbət olmasını göstərir. Bu əsassız bir fikirdir. Çünki yuxarıda da qeyd olunduğu kimi istixarə namazının konkret bir vaxtı yoxdur və istixarəni qılanın da namazdan sonra mütləq yuxu görməsi şərt deyildir. Əksinə, hər kəs ehtiyac duyduğu zaman istixarə qılmalı, sonra Allaha təvəkkül edərək onu maraqlandıran işin icrasına başlamalıdır. İnşaallah bunda xeyir vardır.

***7. Şəriət hansı məsələlərdən ötrü istixarə qılmağa icazə verir?***

Şəriət müsəlmana istər mühüm olsun, istərsə də qeyri-mühüm, istər böyük olsun, istərsə də xırda bütün işlərində istixarə etməyə – Allahdan ən xeyirli olanı istəməyə icazə verir. Hədisdəki "bütün işlərdə istixarə etmək..." hissəciyi də buna dəlalət edir. Çünki bizlərə son dərəcə əhəmiyyətsiz görünən işlərdən bəzən gözləmədiyimiz mühüm məsələlər doğur. Lakin iki növ əməllərdə istixarə qılına bilməz.

Birincisi: vacib və haram buyurulmuş işlərdə şəriət istixarə etməyi məqbul saymır. Çünki insan ona vacib olan zöhr namazını qılıb-qılmaması barədə heç cür istixarə edə bilməz. Yaxud onun qətiyyətlə haram buyurulan sələmi yeyib-yeməməsi barədəki istixarəsi də yersiz və məntiqsizdir. Əgər hər hansı bir vacibatın icra edilməsi üçün kifayət qədər vaxt varsa, şəriət onun icra edilib-edilməməsinə görə yox, icra üçün müəyyən vaxtın təyin edilməsinə görə istixarə etməyə icazə verir. Həmçinin vacib olan iki iş eyni vaxta təsadüf edirsə, onlardan hansının icrasına birinci başlamaq üçün istixarə etməyə icazə verilir.

İkincisi: yemək-içmək və bu kimi gündəlik təkrarlanan adi işlər üçün də istixarə edilməz. Bu kimi işlərin şəriətlə müəyyən edilmiş qaydaları var ki, onlara riayət edən hər kəs özünü zərərə uğramaqdan sığortalamış olur.

***8. Tərəddüd və ya şübhənin olması şərtdirmi?***

Bir çox insanlar belə hesab edirlər ki, istixarə tərəddüdlü və ya şübhəli məsələlər üçün nəzərdə tutulmuşdur. Lakin bu, Peyğəmbərin (s) hədisdəki "Kim bir iş görmək niyyətindədirsə,..." cümləsinə görə yanlış bir fikirdir. Çünki Peyğəmbər (s) "Kim bir iş görmək niyyətindədirsə,..." – deməklə tərəddüdlü və tərəddüdsüz bütün işləri işarə etmişdir. Digər bir tərəfdən Cabirin "bütün işlərdə istixarə etmək..." deməsi də bunu təsdiq edən faktlardandır. Əgər istixarə tərəddüdlü və şübhəli işlər üçün nəzərdə tutulsaydı, onda Cabir hökmən bunu vurğulayardı. Adətən müsəlmanlar hər hansı bir işin icrasına girişdikdə sonunun xeyirli olmasını zənn edərək istixarədən imtina edirlər. Lakin nəticə onların da gözləmədikləri halda uğursuzluqla bitir. Buna görə də hər bir müsəlman istər tərəddüd etdiyi, istərsə də tam əmin olduğu bütün

---

Bu qaydaya əsasən bizi maraqlandıran başqa bir məsələ də var. İstixarə niyyəti ilə qılınan iki rükət namazın özünəməxsus ayrıca məqsədi var, yoxsa burada məqsəd sadəcə iki rükət qeyri-fərz namazı qılmaqdır? Hədisdən də göründüyü kimi istixarə niyyəti ilə qılınan namazın ayrıca, özünəməxsus bir məqsədi yoxdur. Hədisdə "qeyri-fərz namazı" dedikdə fərz namazlarından və bir də günəşin batması və yağışın yağması məqsədilə qılınan namazlar kimi fərqli formaya malik namazlardan başqa istənilən sünnət və nafilə namazları nəzərdə tutula bilər. Ən düzünü bilən isə təbii ki, Allah-taaladır.

[9] Namaz üçün qadağan olunmuş vaxtlar üçdür: sübh namazından sonra günəş tam çıxana qədər, (bu təxminən on beş dəqiqə davam edir), günəş zenitdə olduğu vaxt və əsr namazından sonra günəşin batdığı müddət. Bu vaxtlarda yalnız mütləq nafilə namazlarının qılınması qadağan edilmişdir. Lakin məscidə salam, günəşin batması münasibəti ilə qılınan namaz və bu kimi səbəbli namazların hətta bu vaxtlarda qılınması caizdir.

işlərində istixarə etməli, Allahdan sidq ürəklə ən xeyirli olanı diləməlidir. Unutmaq lazım deyildir ki, hər bir işin sonunu bilən bir varlıq var, o da güc və qüdrət sahibi olan Allah-taaladır.

***9. Allahın məsləhət bildiyi seçim.***

Bəzən insan özünün də daxilən bağlandığı və böyük maraq göstərdiyi müəyyən bir iş üçün istixarə edir. Lakin Allah bunu onun taleyinə yazmamışdır. Məsələn, hər hansı bir kişi sevib bəyəndiyi bir qadınla evlənmək üçün istixarə edir. Ancaq Allah-taala bu qızı onun qismətinə yazmamışdır. İnsan belə vəziyyətlərdə Rəbbi haqda gözəl fikirdə olmalı, Onun qəzavü-qədərilə razılaşmalı və Allahın məsləhət bildiyi seçimin onun üçün ən xeyirli olmasına tam yəqinliklə inanmalıdır. Çünki o heç təsəvvürünə belə gətirmədiyi halda həmin qadın onun bədbəxt olmasına bir səbəb ola bilərdi. Bu barədə Allah-taala Qurani-Kərimdə belə buyurur: **«Bə'zən xoşlamadığınız bir şey sizin üçün xeyirli, bə'zən də xoşladığınız bir şey sizin üçün zərərli ola bilər.(Onu) Allah bilir, siz bilməzsiniz».**[10]

Neçə-neçə insanlar vardır ki, Allahın onlara yazdığını bəyənməzlər, lakin müəyyən bir müddətdən sonra bunun xeyrini görərlər. Həmçinin bir çox insanlar da var ki, müəyyən bir şeyi o dərəcədə istəyir və ona elə bağlanırlar ki, heç özlərinin də xəbəri olmadan bağlandığı şey onların məhvinə səbəb olur. Çünki **«(Onu) Allah bilir, siz bilməzsiniz»**.

Bəzən də elə olur ki, insan müəyyən bir iş üçün istixarə edir və Allah da bu işi ona nəsib edir. Lakin zahirən iş uğursuzluqla nəticələnir. Məsələn, kişi qadınla evlənmək üçün istixarə edir və onunla evlənir. Bir müddət keçdikdən sonra bu ailə dağılır. Belə məqamlarda da insan düşdüyü vəziyyətlə barışmalı, öz taleyinə təslim olmalıdır. Çünki bu hal özünün də bilmədiyi halda çox güman ki, onun üçün xeyirli ola bilər. Bir şey unudulmamalıdır ki, **«(Onu) Allah bilir, siz bilməzsiniz»**.

Real həyatdan götürülmüş bir neçə əhvalatı sizlərin diqqətinə çatdırmaq istərdik:

1980-ci ildə Səudiyyə Ərəbistanı Krallığının paytaxtı ər-Riyad şəhərinin Beynəlxalq Hava Limanında bir təyyarə havaya qalxdı və bir neçə dəqiqədən sonra mühərrikdə baş vermiş nasazlıq ucbatından yenidən hava limanına enməli oldu. Naməlum bir şəraitdə təyyarə yerə endikdən sonra qəfildən alovlanmağa başladı və göyərtəsində olan təxminən üç yüz sərnişindən bir nəfər də olsun, xilas edilə bilmədi. Bu reyslə uçan sərnişinlərdən biri səfər üçün lazım olan bütün tədbirləri görmüş, hətta təyyarəyə giriş üçün buraxılış vərəqəsini də almışdır. Gözləmə zalında oturub təyyarəyə miniyi gözləyirmiş. Bu zaman mürgü onu tutub və bərk yuxuya qalıbmış. Oyandıqda qapıların bağlandığını və təyyarənin uçuş-enmə zolağına doğru istiqamət aldığını görmüş, yerindən sıçrayaraq özünü təyyarəyə çatdırmaq istədikdə məsul şəxs ona mane olmuşdur. Kişi əsəbləşərək özündən çıxmış və az qala başına hava gəlmişdir. Lakin bir neçə dəqiqədən sonra qəza vəziyyətində olan təyyarənin hava limanına endiyini və bədbəxt bir hadisə baş verdiyini eşidən həmin sərnişin dəhşətə gələrək az qala huşunu itirmişdir.

Bir dəfə bir sərnişin öz avtomobili ilə hava limanına gəlir. Lakin açarı maşının içində unutduğunu xatırlayaraq yenidən avtomobilinin yanına qayıdır, açarı çıxarıb geri dönmək onun bir neçə dəqiqə vaxtını alır. Gözləmə zalına qayıdıb gəldikdə təyyarəyə miniyin dayandırıldığını görür və dilxor olur. Ancaq bir neçə dəqiqə keçmir ki, onun üzüntüsü sevincə çevrilir. Həqiqətən də yaşadan və öldürən Allah necə də Pak və Müqəddəsdir!

***10. Nəfsinizin istəklərinə əsla uymayın!***

Bəzi insanlar hansısa bir işi yerinə yetirməyi qarşılarına məqsəd qoyurlar. Bunun üçün onlara istixarə etməyi tövsiyə etdikdə cavabları belə olur: "İstixarəyə nə gərək var. Mən özüm də bu işin xeyirli olacağına əminəm. Durum mənim üçün qənaətbəxşdir". Həqiqətdə isə onlar öz nəfslərinin istəklərinə uyaraq belə deyirlər. Çünki istixarə etdikləri təqdirdə Allahın onlara istəmədikləri bir nəticəni verəcəyindən qorxurlar. Bu doğrudan da çox qəribə bir haldır. Şair yaxşı söyləmişdir:

---

[10] əl-Bəqərə, 216.

**خَالِفْ هواك اذا دعاك لريبةٍ فَلَرُبَّ خيرٍ في مخالفة الهوى**

*Tərcüməsi:*

Nəfsinin istəkləri səni şübhəyə çağırdığı təqdirdə ona müxalif ol. Nə bilmək olar, nəfsə müxalif olmaqda da bir xeyir vardır.

Güc və qüdrət sahibi olan Allahın kəlamı bunu daha gözəl şəkildə ifadə edir: **«(Ya Peyğəmbər!) Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən (onu hələ yaratmamışdan gələcəkdə kafir olacağını bildiyi üçün) yoldan çıxartdığı, qulağını və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü? Allahdan başqa kim onu doğru yola sala bilər?! Məgər düşünüb ibrət almırsınız? (Haqqı bildiyi halda küfr edənin cəzası, haqqı bilmədən, cahilliyi üzündən küfr edənin cəzasından daha ağırdır. Çünki alimlə cahilin məs'uliyyəti eyni ola bilməz!)».**[11]

***11. Duanı oxuyarkən onu dərk etməyin zəruriliyi.***

Zikr, dua və bu kimi söz ibadətlərində məqsəd təkcə dilin bu sözləri tələffüz etməsi deyil, həm də oxunulan duanın mənasını dərk etmək və cümlədəki hər bir sözü daxilən hiss etməyə çalışmaqdır. Əks halda bu duanın təsiri və faydası istənilən effekti verməyəcəkdir. Bir çox insanların şəriətdəki zikr və dualarla lazımi mənfəəti əldə edə bilməmələrinin sirri də elə bundadır. Haqqında danışdığımız istixarə duası da digər dualar kimi şəriətin müəyyən etdiyi dualardandır. Bunun üçün də onun mənasını anlamaq və bu məna ətrafında düşünmək ən azı bu duanın Allahın izni ilə qəbul olması baxımından zəruridir. Gəlin istixarə duasının mənasına yenidən bir nəzər salaq:

***"Allahım! Sənin elminlə Səndən ən xeyirli olanı istəyirəm"*** – Allahım! Sənin hər bir şeyi əhatə edən elminlə Səndən mənə ən xeyirli olanı nəsib etməyini istəyirəm.

***"Sənin qüdrətinlə Səndən güc-qüvvət istəyirəm"*** – Hər şeyə qadir Allahdan Öz qüdrəti sayəsində mənə qismət edəcəyi işin öhdəsindən gəlməyimi təmin etməsini istəyirəm.

***"Səndən əzəmətli fəzilətini diləyirəm"*** – Tanrıdan mənim bilmədiyim və ağlıma belə gətirmədiyim tükənməz xəzinələrinin qapılarını üzümə açmasını diləyirəm.

***"Sən qadirsən, mən isə acizəm"*** – Allahın yenilməz qüdrəti qarşısında öz acizliyimi etiraf edirəm.

***"Sən bilirsən, mən isə xəbərsizəm"*** – Hər bir şeyi bilən yeganə varlıq, bütün nöqsanlardan pak Allah qarşısında öz elmsizliyimi və avamlığımı etiraf edirəm.

***"Həqiqətən, qeybləri (görünməyənləri) bilən ancaq Sənsən!"*** – Sən bütün işlərin sonunun nə ilə bitəcəyini, yaxın və uzaq gələcəkdə onların hansı şəkil alacağını bilirsən. Bunu səndən başqa heç kəs bilmir.[12]

***"Allahım! Bu işimin (görüləcək işin adı çəkilir) mənim dinimdə, məişətimdə və işimin sonunda, gec və ya tez olmasının mənim üçün xeyirli olacağını bilirsənsə, onu mənim qismətimə yaz..."*** – Bu azsaylı kəlmələr insanın yaxın və uzaq olan digər dini, dünyəvi və uxrəvi mənafelərini özündə cəmləşdirir. İlahi! Bu necə də möhtəşəm, mükəmməl və geniş əhatəli bir duadır. Müsəlmanın nail olduğu hansı xeyir istixarəsinin qəbul olacağı təqdirdə əldə etdiyi bu xeyirdən daha böyük ola bilər?!

***"Onu mənim üçün asanlaşdır və bərəkətli et"*** – Ey Tanrım! Səndən bu işimi asanlaşdırmağı və bu işdə mənə xeyir-bərəkət verməyi istəyirəm. Çünki iş qismətimdə olsa da asanlaşdırılmış olmaya bilər və yaxud həm qismətimə yazılsa, həm də asanlaşdırılmış olsa belə xeyir-bərəkəti olmaya bilər.

***"Yox, əgər bu işimin (görüləcək işin adı çəkilir) mənim dinimdə, məişətimdə və işimin sonunda, gec və ya tez olmasının mənim üçün xeyirli olmayacağını bilirsənsə, onu məndən uzaqlaşdır"*** – Onu mənim qismətimə yazma.

---

[11] əl-Casiyə, 23.

[12] Qeyd: Qeyb təkcə gələcəyə deyil, həm də hal-hazırda olub, lakin insan elmindən və gözündən uzaq olan hər bir şeyə şamil olunur. Ona görə də Allah-taala Yusuf əleyhissəlamın hekayəsini uzaq keçmişdə baş verməsinə baxmayaraq qeyb adlandırmışdır.

***"…məni də ondan uzaqlaşdır"*** – Elə et ki, ona meyl göstərməyim, ona bağlanmayım və onu icra etməyə gücüm çatmasın. Bir sözlə, istənilən yolla bu işin qapılarını mənim üzümə bağla!

***"Mənə harada olur olsun, xeyirli olanı nəsib elə"*** – Hətta istəmədiyim halda belə ən xeyirli olanı mənim qismətimə yaz.

***"Sonra da məni ondan razı sal"*** **–** Qismətimə yazdığından məni razı sal, qəlbimi geniş və rahat elə!

Şübhəsiz ki, hər şeyi dəqiqliyi ilə bilən ancaq Allah-taaladır!

***12. İstixarənin təkrarlanması şəriətə uyğundurmu?***

İstixarənin yeddi dəfə təkrarlanması barədə İbn əs-Sunni Ənəsdən bir zəif hədis rəvayət etmişdir. ən-Nəvəvi həmin hədisin isnadında naməlum şəxslərin adları olduğuna görə onu qərib hədis adlandırmışdır. Sualın cavabına gəlincə, əgər insan bir iş barədə bir dəfə istixarə edir, nəticə olmursa, sonra başqa bir işə girişməyi niyyət edirsə, yeni başlamaq istədiyi iş üçün istixarə etməlidir.

***13. İstixarə dua hesab olunurmu?***

İstixarə özündə dua statusunu cəmləşdirsə də, adi dualardan öz xüsusiliyi ilə fərqlənir. Çünki Peyğəmbər (s) istixarəni bir quran surəsi kimi səhabələrinə öyrədərdi. İkinci bir tərəfdən istixarə başqa dualardan iki rükətli namazı ilə də seçilir. Üçüncü bir tərəfdən isə onu demək olar ki, istixarənin şəriət tərəfindən müəyyənləşdirilmiş xüsusi bir duası vardır. Buna görə də bəzi ilahiyyatçılar istixarəyə nəyinsə əlavə olunmasının, yaxud başqa bir dua ilə istixarə edilməsinin əleyhinədirlər. Lakin adi duaların qəbul olunma şərtləri istixarəyə də şamil edilir. Bu şərtlər hansılardır? Güc və qüdrət sahibi olan Allaha, Onun qüdrətinə, elminin genişliyinə səmimi qəlbdən iman gətirmək, sidq ürəklə Ona yönəlmək və Ona təvəkkül etmək. Bəs duanın qəbul olunmasına mane olan amillər hansılardır? Allaha olan imanın zəifliyi, qəlbin Allahdan qeyrisinə olan bağlantısı, asilik, günah və haram yeməyə davam etmək.[13] Əgər sadaladığımız bu şərtlərə əməl olunarsa, duanın qəbul olunmasına maneçilik törədən amillər aradan qaldırılarsa və bəndə sidq ürəklə əllərini Tanrıya açaraq dua edərsə, Allah-taala onun açdığı əllərini əliboş geri qaytarmaz və ona bütün işlərində ən xeyirli olanı nəsib edər.

***14. Nə zaman namazsız dua ilə kifayətlənmək olar?***

Bəzən insan elə şəraitə düşür ki, ya vaxtın darlığından, xüsusilə qadınlarda aybaşı müddətində və ya doğuşdan sonra qırx gün ərzində iki rükət namaz qılmağa imkan tapa bilmir. Belə olan halda imkan daxilində istixarənin onun qarşını kəsən maneə aradan qaldırılana kimi təxirə salınması tövsiyyə olunur. Əks təqdirdə Allahın **«Allahdan bacardığınız qədər qorxun»**[14] və **«Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyər (bir işə mükəlləf edər)»**[15] ayələrini əldə rəhbər tutaraq namazsız dua ilə də kifayətlənmək olar.

***15. Bu ancaq mömin bəndə üçündür.***

Bu mühüm ibadətdə kafirə heç bir pay düşmür. O küfrün və cəhalətin zülməti içində çapalayır, nəfsinin istəklərinin quluna çevrilir, həyatın məqsədinin nə olduğunu belə bilmir. Onun bu həyatda mövcud olması şəhvani hislərini və heyvani istəklərini təmin etməkdən başqa bir şey deyildir. Onun həyatı ormandakı vəhşi heyvanların yaşayış tərzindən nəinki fərqli, hətta daha alçaq və daha uçurumludur. Zərəri xeyirindən çox, yoxluğu varlığından yaxşıdır. Bəzi işlərindəki əldə etdiyi zahiri uğur, boş və müvəqqəti olan bu dünyadakı uğurudur ki, o da gəldiyi kimi tez bir müddətdə də yox olub gedəcəkdir. Axirətdə isə onu gözləyən bir şey varsa, o da cəhənnəm alovudur. Allah-taala bu tip insanları belə vəsf edir: **«Kim (axirətdən vaz keçib)**

[13] Allaha şirk qoşmaq başda olmaqla asilik və günahın bütün növləri uğursuzluğa, ruzi qapılarının bağlanmasına və məyusluğun artmasına gətirib çıxaran ən başlıca səbəblərdəndir.
[14] ət-Təğabun, 16.
[15] əl-Bəqərə, 286.

**dünyanı və onun bərbəzəyini istəyirsə, Biz ona əməllərinin əvəzini (sağlamlıq, sərvət, övlad, gözəl yaşayış) elə orada (dünyada) verərik. Onların dünyadakı mükafatları əsla azaldılmaz. (Dünyada yaxşı işlər görüb e'tiqadı olmayan şəxsə axirətdə dünyəvi əməlləri heç bir fayda verməz. Çünki Allah ona dünyadakı yaxşı əməllərinin əvəzini elə dünyanın özündə verər). Belələrini axirətdə atəşdən (cəhənnəm odundan) başqa heç bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar!»**[16]

Möminə gəlincə, onun təbiəti başqadır. O, Allahını tanıyar, Ona və Onun qəzavü-qədərinə iman gətirər, bir iş görmək fikrinə düşdükdə, yaxud görmək istədiyi işin doğru və ya yalnış olduğu ona qaranlıq qaldıqda pak və müt'i bir vəziyyətdə Tanrının hüzurunda dayanaraq Ondan doğru yolu, müvəffəqiyyəti və düzlüyü istər, namazını bitirdikdən sonra Allahdan yardım diləməklə, Ona təvəkkül etməklə, qəzavü-qədərindən məmnunluq duymaqla, Allahın hər şeyə qadir və hər şeyin bilicisi olmağına tam yəqinliklə öz yoluna davam edər, istixarəsinin nəticəsi dərhal ona məlum olmadıqda belə, Allahın yazdığı qismətin ən xeyirli olmasını bütün varlığı ilə qəbul edər. Belə olan halda Allah da Öz növbəsində onu bütün şərr əməllərdən uzaq saxlar, bu həyatda Allah nuruna, haqq yoluna nail olmağı onun üçün daha da asanlaşdırar, ona elə misilsiz bir uğur nəsib edər ki, bu uğur təkcə bu dünyada deyil, həm də axirət həyatında əbədi bir uğura çevrilmiş olar.

***16. İstixarədən sonra nə etməli?***

Müsəlman istixarədən həm əvvəl, həm də sonra görəcəyi iş barəsində yaxınları ilə, inandığı və etimad göstərdiyi ilahiyatçılarla, elm adamları ilə, təcrübəli insanlarla, aidiyyatı mütəxəssislərlə məsləhət-məşvərət etməli onların bilik və təcrübələrindən bəhrələnməlidir. Bu baxımdan da Allah-taala Peyğəmbərinə (s) xitabən belə buyurur: **«...işdə onlarla məsləhətləş...».**[17]

Ümumiyyətlə, məsləhətləşmə doğru yola aparan bir işıqdır. Ancaq öz fikrinə güvənərək heç kəsin məsləhətinə qulaq asmayan insanlar unutmamalıdırlar ki, bununla böyük bir təhlükənin qurbanı ola bilərlər. Bu barədə ərəblərin belə bir sözü var: insanlar üç qrupa bölünürlər. Əsl insanlar, yarımçıq insanlar və insan olmayan insanlar. Birinci qrupdakı insanlar həm ağıllı, həm də başqalarının məsləhətindən bəhrələnən insanlardır. İkinci qrupda ağlı olub, lakin heç kəsin məsləhətini qəbul etməyən insanlar cəmləşir. Üçüncü qrupda isə həm ağlı olmayan, həm də heç bir məsləhət dinləməyən insanlar yer alır.

Ömər ibn Əbdüləziz (Allah ona rəhmət eləsin!) bu barədə söyləmişdir: "Məsləhət və müzakirə mərhəmət evinin qapıları, xeyir-bərəkət qapılarının isə açarlarıdır. Bunlarla nə uçuruma düşülməz, nə də ağıl azalmaz".

əl-Fudeyl demişdir: "Məsləhətləşmədə xeyir-bərəkət vardır. Mən hətta kənizim olan bu həbəşli əcəmi qadından belə məsləhət alıram".

Bəzi müdriklər demişdir:

"Məşvərət düzlüyə, mütləqiyyət isə özbaşnalığa gətirir".

"İstixarə edən ümidsizliyə qapılmaz, məşvərət edən peşman olmaz".[18]

"İnsanlarla məsləhətləşən onların ağlına şərik olar".

Bu barədə şair yaxşı deyib:

**شاور سواك إذا نابتك نائبةٌ   يوما وإن كنت من أهل المشوراتِ**
**فالعينُ تنظُرُ منها ما دنا و نأى   ولا ترى نفسها إلا بمرآةِ**

*Tərcüməsi:*

---

[16] Hud, 15-16.
[17] Ali-İmran, 159.
[18] Bəzi insanlar bu hikmətli kəlamı bir hədis olaraq qəbul edirlər. Əslində isə bu, əl-Albaninin "Zəif və qondarma hədislər silsiləsi"ndə (2/78) də qeyd etdiyi kimi qondarma bir əsərdir.

Bir gün bəxtın dönüklüyü səni yaxalarsa, məşvərət əhlindən olsan belə hökmən başqalarından məsləhət al. Gözlə yaxında və uzaqda olanları görmək olur. Amma onun özünü ancaq güzgüdə görmək mümkündür.

# HÖRMƏTLİ MÜSƏLMAN QARDAŞ VƏ BACILAR!

İstixarə müvəffəqiyyətə aparan yolda ən başlıca addım, bu dünya və axirətdə zəfərə nail olmaq üçün ən gərəkli vəsilədir. Lakin bununla yanaşı qabaqcadan ölçüb-biçmə, planlaşdırma və məsləhətləşmə kimi digər metodlardan da yeri gəldikdə istifadə etmək və başqalarının təcrübəsindən bəhrələnmək zəruridir. Bu baxımdan da heç bir kəsə bel bağlamadan icrası mümkün olan bütün halal tədbirlərə əl atmaq şəriətin icazə verdiyi addımlardandır.

Əgər bəndə sidq ürəklə istixarə qılıb tam olaraq Allaha təvəkkül etsə, Allah da bütün səbəbləri onun üçün yüngülləşdirər və qismətinə nail olmaq üçün üzünə bağlanmış uğur qapılarını taybatay açar. **Bu, Allahın dilədiyi kimsəyə əta etdiyi lütfdür (mərhəmətdir). Allah çox böyük lütf (mərhəmət) sahibidir!**

Əziz müsəlman qardaşlar! Siz də Allahın bu lütf və mərhəmətindən az da olsa pay umursunuzsa, hər bir işinizdə istixarə etməyi unutmayın!

***Əziz müsəlman tacirlər!***

Hər hansı bir müqaviləni və ya ticari sövdələşməni imzalamazdan, dükan açmazdan, işçi qəbul etməzdən və hansısa layihəni həyata keçirməzdən öncə istixarə etməyi unutmayın!

***Əziz vəzifə sahibi olan müsəlmanlar!***

Hər hansı vəzifəyə getməzdən qabaq, işinizdə qalıb-qalmamaq barədə tərəddüd etdikdə istixarə etməyi unutmayın!

***Əziz müsəlman həkimlər!***

İxtisas seçimi etməmiş, bir xəstəxanadan başqasına köçməmiş, klinika açmamış, cərrahiyyə əməliyyatına girməmiş və mənfi təsir göstərəcəyindən ehtiyat etdiyiniz hansısa resepti yazmamış istixarə etməyi unutmayın!

***Xəstəliyə düçar olmuş müsəlmanlar!***

Xəstəxanaya getməzdən, cərrahiyyə çarpayısına uzanmazdan, stomatoloq kürsüsünə oturmazdan, hər hansı orqanının kəsilməsindən və zərərindən qorxduğunuz dərmanı qəbul etməzdən əvvəl istixarə etməyi unutmayın!

***Əziz müsəlman atalar!***

Yeni mənzil, cihaz və ya əşya almazdan, başqa mənzilə köçməzdən, yeni sürücü və ya xadimə işə götürməzdən, oğlunuza avtomobil almazdan, xanımlarınız və ya övladlarınızla səyahətə çıxmazdan qabaq istixarə etməyi unutmayın!

***Əziz müsəlman bacılar!***

Zərurət olmadan evdən çıxdıqda, naməhrəm sürücü ilə yanınızda başqa qadın olsa belə eyni avtomobilə minmək zərurəti yarandıqda, evdən kənarda qadınlara icazə verilən iş sahələrində işləməyi düşündükdə, bazara, yaxınlıqdakı parka, rəfiqəniz gilə, qonaqlığa və ya toya getmək istədikdə, yaxud zinət əşyaları, pal-paltar almağı düşündükdə, ərə getməyə qərar verdikdə, hətta ərlərinizin razılığı olsa belə hamiləliyin qarşısını alan vasitələrdən istifadə etdikdə istixarə etməyi unutmayın!

***Əziz müsəlman gənclər!***

Təhsil, iş, səyahət və ya digər məqsədlərlə xarici ölkələrə səfər etmək istədikdə, avtomobil almağa qərar verdikdə, elçi göndərməzdən əvvəl və ümumiyyətlə, hər hansı bir işə girişməzdən öncə istixarə etməyi unutmayın!

***Əziz müsəlman tələbələr!***

Hər hansı bir məktəbə yazıldıqda, sənədlərinizi ali məktəbə təqdim etdikdə, ixtisas seçimi apardıqda, təhsil aldığınız ali məktəbdən başqa bir ali məktəbə dəyişirildikdə, hansısa səbəbdən təhsilinizi yarımçıq buraxmağı düşündükdə istixarə etməyi unutmayın!

## SON SÖZ

Hörmətli oxucu! Bir şeyi bilmək lazımdır ki, əgər sən bu deyilənlərə sidq ürəklə əməl etsən, ağlına belə gətirməyəcəyin bir şəkildə Allahın əzəmətli qüdrətinin, geniş əhatə dairəsinə malik elm və mərhəmətinin şahidi olacaq, o an özünü saxlaya bilməyib qəlbinin ən dərin guşələrindən böyük bir həvəslə deyəcəksən:

**أشهد أن لا إله إلا الله وحده لا شريك له، له الملك وله الحمد وهو على كل شيء قدير، ما شاء الله كان وما لم يشأ لم يكن ولا حولا ولا قوة إلا بالله العلي العظيم**

"Şəhadət verirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. O tək və şəriksizdir. Mülk və həmd ancaq Ona məxsusdur və O hər şeyə qadirdir. Allahın istədiyi hər bir şey olur, Onun izni olmadan nəyinsə baş verməsi mümkünsüzdür. Güc və qüdrət sahibi ancaq uca və əzəmətli olan Allahdır".

Sonda bir daha Allaha bol-bol həmd-sənalar edir, Peyğəmbərimiz Məhəmmədə (s) Allahın xeyir-duası və salamı olsun deyirik!

*Məhəmməd ibn Əbdüləziz əl-Müsnəd*
*ər-Riyad şəhəri, 1993-cü il.*

